# Akademik yazı qaydaları

İnformasiya-kommunikasiya texnologiyalarının yaratdığı imkanlar sayəsində yazmaq meylləri çoxalıb. Qloballaşmanın, informasiya-kommunikasiyanın gətirdiyi yenilik və üstünlüklərdən biri də elm və təhsil sahəsində standartların vahid bir forma alması və bunun tez bir zamanda yayılaraq dünya elmi ictimaiyyəti tərəfindən fəal istifadə olunmasıdır. Sovet təhsil sistemində akademik yazı qaydalarına tətbiq olunan normalar beynəlxalq təhsil məkanında qəbul edilmiş analoji standartlara uyğun gəlmir.

Akademik yazı elmin və ali təhsilin ayrılmaz atributlarından biridir, onun özəlliyini müəyyənləşdirir. Təəssüf ki, akademik və ya peşəkar yazı qaydaları universitetlərdə ayrıca bir fənn kimi tədris olunmur. Beynəlxalq akademik yazı qaydalarına bələd olmaq həm də dünya elm və təhsil sisteminə inteqrasiya olmaq, qəbul olunmuş standartları mənimsəmək  deməkdir - bu qaydalarına əməl etmək savad və mədəniyyət göstəricisidir, "ümumi dil" rolunu oynayır, fərqli ölkələrdən olan elm adamlarının yazı vasitəsilə bir-birini anlamasına yardım edir.

Akademik yazı qaydalarının dünyada qəbul edilmiş modeli inkişaf etmiş ölkələrdə hazırlanmış, müzakirə yolu ilə təkmilləşdirilmiş, cilalanmış və tətbiq edilmişdir. Əslində bu qaydalar müəyyən nəticənin əldə edilməsinə yönəlmiş bir mexanizmdir, yazı müəllifinin oxucu qarşısında sosial və mənəvi məsuliyyətini artırır. Akademik yazı qaydaları həmçinin intellektual mülkiyyət məsələsini aktuallaşdırır, elmi iş (tezis, məqalə, kurs işi, referat, dissertasiya və s.) yazmaq mədəniyyətini formalaşdırır, tələbə, magistrant, doktorant və gənc tədqiqatçıları elmi fikirləri yazılı formada çatdırmanın müasir üsulları və formaları haqqında ətraflı məlumatlandırır,  beynəlxalq elm və təhsil məkanına maneəsiz qoşulmağa imkan verir.

Akademik yazı qaydaları belə müəyyənləşdirilir:

*Ön hissə*

- Titul vərəqi
- Mündəricat
  - –yazının strukturunu əks etdirir
  - –məntiqi ardıcıllığı və problemin təhlilindəki bölgüləri göstərir
  - –yazıdakı fəsilləri və onlara aid hissələri əks etdirir
- Minnətdarlıq yazısı (akademik işin yazılmasında köməklik göstərən şəxslərə minnətdarlıq)
- Abstrakt
- Xülasə
  - a)elmi yazı işinizdəki əsas fikir və tapıntıları çatdırır;
  - b)onları qısa və yığcam şəkildə ifadə edir:
    - –tədqiqatın məqsədi və vəzifələri
    - –problemi
    - –tədqiqat metodu
    - –tapıntılar

*Yazının əsas hissəsi*

•Giriş
–Tədqiqatın məqsədi və obyekti haqqında ətraflı məlumat verir;
–Problemi və ya vəziyyəti təhlil edir;
–Mövcud tədqiqatları təhlil edir. Boşluqlar qeyd olunur;
–Tədqiqat sualı qeyd olunur;
–Tədqiqat metodu göstərilir;
–Tədqiqatın çətinliklərini və imkanlarını ifadə edir;
–Lazım gəldikdə, mövzuya dair tarixi məlumat verilir.
•Fəsillər – arqumentlər və əsaslandırmalar:
–Mövzu fəsillərə və yarım-fəsillərə bölünməlidir.
–Arqumentlərinizin məntiqi ardıcıllığı gözlənilməlidir.
–Əsaslandırma olaraq cədvəl və diaqramlar qoyulmalı və izah edilməlidir.
–Hər bir cədvəl və ya diaqram nömrələnməlidir. Məsələn: Cədvəl 1 və s.
–Bir hissədən digərinə keçid olmalıdır.
- Hər bir hissənin sonunda əhatə olunan mövzuya dair 1-2 cümlə ilə nəticə göstərilməlidir.

*Yekun hissə*

•Nəticə və tövsiyələr
–Əsas hissədə təhlil olunan fikirlər ümumiləşdirilir.
–Arqumentlərə əsasən hansı addımıların atılmasının zəruri olması haqqında tövsiyyələr edilir.

*Akademik yazıya əlavələr*

•Mənbələr – istifadə olunan resurslar, kitablar, məqalələr və s.
• Qoşmalar –əlavə statistik məlumat, qrafiklər, diaqramlar, xəritələr və s.

## KONSPEKT

Konspekt dərslikdəki materialı mənimsəməkdə yardımçı rol oynayır, mövzu ilə bağlı əlavə ədəbiyyata da müraciət olunmalıdır. Konspekt latınca “icmal» mənasını ifadə edir – informasiyanı sistemləşdirir, ümümləşdirir və sıxlaşdıraraq bərpa edir. Hər hansı konkret məqamda onu mükəmməl şəkildə hazırlamaq və istifadə etmək üçün aşağıdakı məsələlərə diqqət yetirmək lazımdır:

–mətnin ümumi kompozisiyasına köklənmək;
–məlumatın məntiqi-fikri istiqamətini görmək;
–ümumilikdə ilkin mətn müəllifinin informasiyanı ifadə etmə sistemini anlamaq və həmçinin hər bir fikrin inkişaf xəttini tutmaq;
–mətnin başlıca məzmununu səciyyələndirən fikrin əsas məqamlarını aşkarlamaq;
–informasiyanı detallaşdıran təyinatları müəyyənləşdirmək;
–çıxış edərkən mətnin əsas hissəsi və nəticələrinə təyinat vermək bacarığını nümayiş etdirmək;
–əsas informasiyanı yazılışda büsbütün və ya bənd-bənd deyil, lakonik ifadədə formalaşdırmaq.

Konspekt tiplərinin *planlı, tekstual, toplu* və *tematik* növləri də fərqləndirilir. Planlı konspekt əsərin hazırlanmış ilkin planı əsasında qurulur. *Tekstual konspekt* əsasən sitatlar üzərində qurulur, bəzən ona sitatlı konspekt də deyilir. *Toplu konspekt* çıxarışları, sitatları, bəzən tezisləri də uzlaşdırır, mətninin bir hissəsi planla da təchiz oluna bilər. Tematik konspekt xalis öyrənmə təyinatlı olmaqla, mövzu üzrə qoyulan sualın açılışını bir neçə mənbədən qaynaqlandıraraq daha bitkin və dolğun cavablandırır.

# Elmi məqalə

Müəyyən həyat hadisələrinin qanunauyğunluğunu və səciyyəvi cəhətlərini aydınlaşdırmaq, faktlarla ictima-siyasi mahiyyətini, əməli əhəmiyyətini aşkara çıxarmaq məqalənin fərqləndirici xüsusiyyətidir. Hər hansı mühüm məsələ tədqiq və təhlil olunur, ictimai təcrübə ümumiləşdirilir, düzgün praktik nəticələr çıxarılır.

İnformasiya toplamaq, elmi məzmunlu məsələləri araşdırıb ərsəyə gətirmək və onları məqalə formasında yazmaq məharət tələb edir.

Elmi məqalə müəyyən bir konkret mövzu üzrə mini-araşdırmadır. Onların müxtəlif formaları vardır:

1. Elmi-nəzəri – axtarışların nəzəri izahı və qanunauyğunluq əsasında yerinə yetirilmiş araşdırmaların nəticələrinin təsviri.

2. Elmi-praktik – empirik olaraq eksperimentlərin real təcrübələr əsasında qurulması.

Elmi məqalə müəllif araşdırmalarının nəticələrini, tövsiyələrini özündə birləşdirən eksperimental və ya analitik fəaliyyətdir. İlk növbədə məqalənin mövzusu müəyyənləşdirilməlidir; əvvəlcədən mövzu haqqında ətraflı məlumatın olması mühüm əhəmiyyət kəsb etmir, əsas məsələ, yazılacaq məqalənin mövzusuna dair əsaslı məlumatları haradan götürüləcəyi haqda təsəvvürün olmasıdır - belə bir mövzuda məqalənin mövcud olub-olmamağı yoxlanmalıdır. Açar sözlərlə məqalənin məzmunu haqqında ümumiliklər olmalı, **g**irişdə məqsəd və obyekt haqqında məlumat verilməlidir. Elmi məqalə yenilik effekti daşımalıdır, ona görə də araşdırılan mövzu, əldə edilən nəticələr əvvəllər çap olunmamalıdır. Məqalənin nəşr olunması üçün elmi jurnal seçərkən onun məqsəd və istiqaməti, impakt faktoru, indeksləşdiyi elmi bazalar və oxucu auditoriyası nəzərə alınmalıdır. Elmi əsərləri oxumamaq, plagiatlığa yol vermək, məqalənin əsas məğzini itirmək, yanlış istinadlar, obyektiv hökmlərdən daha çox subyektivliyə üstünlük vermək, redaktor və rəyçilərin iradlarını qəbul etməmək elmi məqaləyə xələl gətirən amillərdir.

Məqalə ideyanın yaranması, tədqiqi və yazılma mərhələlərindən ibarətdir: adı qısa olmalı, oxucuya haqqında işarə verməli və diqqətini cəlb etməlidir. Açar sözlər, giriş, icmal, metodologiya, tədqiqatda əldə olunan elmi yenilikləri əks etdirən nəticə əhəmiyyətin dərk olunmasına kömək edir. Xülasə məqalədəki məzmunu özündə əks etdirir, əsas aspektləri, onların interpretasiyası haqqında məlumat və cavab verir.

Məqalə məntiqi hissələrə bölünür və hər biri üçün uyğun bir başlıq verilir. Mətndə durğu işarələri, orfoqrafiya və digər növ səhvlər olmamalıdır. Təriflər kimi vacib mətnlər kursiv və ya qalın (bold) olur – o zaman oxucu bu məlumatların həqiqətən vacib olduğunu, buna xüsusi diqqət yetirmək lazım olduğunu düşünür.

# Kurs işi

*Kurs işi* ali məktəblərdə ixtisas müəlliminin rəhbərliyi altında tələbələrin tədris planına uyğun gördükləri müstəqil elmi-metodik işdir; aşağı kurslarda referat, yuxarı kurslarda isə elmi-tədqiqat xarakterlidir. Tələbələrdə müstəqil elmi yaradıcılıq fəaliyyəti vərdişi formalaşdırır, nəzəri və peşə hazırlığının artırılmasına, tədris materialına daha yaxşı yiyələnməsinə, mənimsəməsinə, problemləri həll etmək bacarığının inkişafına kömək edir, müasir elmi-tədqiqat metodlarını və hər hansı məsələni daha dərindən araşdırıb təhlil etməyi öyrədir

**Kurs işinin məzmununa verilən ümumi tələblər:**

–mövzu seçimi kafedra tərəfindən hazırlanan təxmini magistr işinə əsaslanmalı, tələbənin özü tərəfindən seçilməlidir;

–tələbənin müstəqil yaradıcılıq xarakteri, problemləri müstəqil həll etməsi üçün praktik bacarığı və lazımi nəzəri, praktik biliyi olmalıdır;

–girişdə tədqiqat mövzusunun aktuallığı, tədqiqatın obyekti, mövzusu, məqsəd və vəzifələri, metodoloji əsasları, tənzimləyici, nəzəri və empirik əsasları, quruluşu haqqında məlumat verilməlidir;

–istinad materialı, səliqəli şəkildə icra edilməlidir;

–təkrar istinadda mənbə yalnız ilk qeydə əsaslanmalıdır;

-tələbə məlumat toplama, işləmə və sistemləşdirmə - rasional metodlardan istifadə etməlidir;

–materialları toplayarkən və ümumiləşdirərkən yalnız müsbət deyil, mənfi faktları da seçməli, tənqid əsassız yox, obyektiv və konstruktiv olmalıdır;

–ən azı 20 ədəbiyyat mənbə kimi göstərilməli, kurs işi ilə əlaqəsi olmayan mənbələrdən sitat verilməməli, ədəbiyyat siyahısında adları yazılmamalıdır;

–işdə yazı, punktuasiya (durğu işarələri) qaydaları, abzas, yazı seçimi (şriftlər), mətn daxilindəki sitatların dırnaq işarəsi ilə ayrılması qorunmalıdır;

–tədqiqatın yekun hissəsi olan nəticə qısa, mətninin məzmununu təkrarlamadan, problemin həllini əsaslandırmalıdır;

–əsərin mətnini tamamlayan materiallar (tətbiqi qrafik materiallar, geniş formatlı cədvəllər, hesablamalar, alqoritmlər və s.) əlavələr bölməsində yerləşdirilməlidir;

–tədqiqatın sonunda istifadə olunan qısaltmaların siyahısı verilməlidir (əgər varsa);

–səhifə nömrəsi sağ alt küncdə yerləşir.

–başlıqlar qalın hərflərlə yazılır (şrift 14);

–iki və ya daha çox sətirdən ibarət bir başlıq bir sətir aralığı ilə çap olunur;

## Kurs işinin tərtibinə verilən texniki tələblər

*1.Kurs işinin quruluşu aşağıdakı kimi olmalıdır:*

–titul vərəqi (əlavə edilir);

–kurs işi üçün tapşırıq vərəqi (semestrin əvvəlində tələbəyə verilməlidir);

–mündəricat (əlavə edilir);

–giriş;

–əsas hissə;

–nəticə;

–istifadə olunan ədəbiyyatın siyahısı (əlavə edilir);

–əlavələr (lazım olduqda);

*1.1.Kurs işinin titul vərəqində aşağıdakı informasiya əks olunmalıdır:*

–ali məktəbin, fakültə və kafedranın adı;

–kurs işinin adı;

–tələbənin soyadı, adı və atasının adı;

–ixtisas və qrup nömrəsi;

–elmi rəhbərin soyadı, adı, atasının adı, elmi dərəcəsi və elmi adı;

–kurs işinin müdafiəsi, təhvil vermə tarixi, elmi rəhbərin imzası və qiyməti;

–təhsil müəssisəsinin yerləşdiyi şəhər;

–işin yazılma tarixi.

*1.2.Kurs işinin həcmi:*

–əsas hissə kompüterdə yığılmış 10-15 vərəqdən ibarət olmalıdır (A3 Times, AzLat 14).

–mətndəki sözlər, formullar və ya şərti işarələr eyni rəngdə və ölçüdə olmalıdır.

–mətndə aşağıdakı ölçülərə riayət etməklə yazmaq lazımdır:

yuxarı – 2 sm, aşağı – 2 sm, sol – 2.5 sm, sağ – 1.5 sm.

–sətirlərarası məsafə – 1.5, başlıqlar və sonrakı sətir ilə başlıq arasındakı məsafə – 2 sm olmalıdır.

–ayrı sətirdə çap olunmuş “Mündəricat”, “Giriş”, “Nəticə” sözləri müvafiq struktur hissələrinin başlığı olmalıdır. Başlıqların altından xətt çəkilmir, sonunda nöqtə qoyulmur.

*Kurs işində plagiatın olub-olmamağı yoxlanılır.* İşin rəhbəri belə bir yoxlama olacağı, istifadə etmənin dərəcələri və işi təhvil verməmişdən əvvəl müstəqil olaraq onu yoxlamalı olduğu barədə tələbəni məlumatlandırmalıdır.

İşin bütün vərəqləri bir qovluğa tikilməli və ya cildlənməli, bitirilmiş və tam tərtib edilmiş kurs işi və onun elektron variantı (diskdə) elmi rəhbərə təqdim edilməlidir.